

*“Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır”.*

**Heydər Əliyev**
**Ümummilli Lider**

100



*“Azərbaycanın əldə etdiyi bütün nailiyyətlərin əsasında məhz müəllimin gərgin zəhməti və gündəlik fəaliyyəti durur”.*

**İlham Əliyev**
**Azərbaycan Respublikasının**
**Prezidenti**



1921-ci ildə yaranan Azərbaycanın ən böyük universitetlərindən biri olan Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin orta ümumtəhsil, orta ixtisas və məktəbəqədər təhsil müəssisələri üçün ali təhsilli pedaqoji kadrlar hazırlayan bir təhsil ocağıdır. 100 il ərzində zəngin inkişaf yolu keçmiş universitet yarandığı vaxtdan indiyədək Azərbaycan təhsil sistemi üçün on minlərlə müəllim yetişdirib.

ADPU-nun məzunları sırasındakı ölkəmizdə və onun hüdudlarından kənarda tanınan çoxsaylı müəllimlər, alimlər, ictimai-siyasi xadimlər, yazıçı və şairlər, bəstəkarlar bu ali təhsil müəssisəsinin nüfuzunun geniş şəkildə artmasında mühüm rol oynamışlar. Böyük qürur hissi ilə deyə bilərik ki, Azərbaycan Milli Elmlər Akademiyasının 11 prezidentinin 3-ü, - Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev, 5 vitse-prezidenti – Heydər Hüseynov, Səməd Vurğun, Zahid Xəlilov, Əlisöhbət Sumbatzadə və İsa Həbibbəyli ADPU-nun məzunlarıdır. Şöhrətli elm və təhsil ocağına çevrilmiş universitetin son 50 ildə qazandığı böyük uğurlar ümummilli liderimiz Heydər Əliyev və onun ideyalarının layiqli davamçısı olan cənab prezident İlham Əliyevin elm və təhsilə göstərdikləri böyük qayğı və diqqət sayəsində əldə edilmişdir. Ulu öndərimiz 5 dəfə bu universitetə gəlmiş, ali təhsil ocağını dövrün ən yüksək mükafatlarından olan "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif etmiş, professor-müəllim heyətini və tələbələri mükafatlandırmış, kollektivə dəyərli tövsiyə və məsləhətlər vermişdir. ADPU ölkəmizdə müəllim hazırlığının mərkəzi hesab edilir. Hazırda universitet öz şərəfli və müqəddəs missiyasını uğurla yerinə yetirir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2021-ci il aprelin 17-də **"Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında"** Sərəncamı bir əsr ərzində əldə olunmuş nailiyyətlərə verilmiş ən yüksək qiymətdir.

**Professor Cəfər Cəfərov**
**Rektor**



Azərbaycan Dövlət Pedaqoji İnstitutu (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU)) 26 avqust 1921-ci ildə hökumətin qəbul etdiyi 66 saylı dekretlə alitəhsilli müəllim hazırlamaq üçün təsis edilib. Bu illər ərzində daha da inkişaf edərək 8 fakültəyə malik ən nüfuzlu ali məktəblərdən birinə çevrilib. Bu günədək ADPU-nun 160 mindən çox məzunu olub. İnstitut bərqərar olunarkən kadrları arasında bir nəfər də alimi olmayan ADPU bu günə kimi saysız-hesabsız professorlar, dosentlər, elmlər namizədləri, akademiyanın müxbir üzvləri və s. elm xadimləri hazırlayıb. Hazırda ADPU-da filiallar və Pedaqoji Kolleclə birlikdə təxminən 20 min tələbə təhsil alır. Universitetdə 70-ə yaxın elmlər doktoru, 60-dan çox professor, 300-ə yaxın dosent, 350-dən çox fəlsəfə doktoru çalışır. ADPU-da ali təhsilin bakalavriat səviyyəsində 22 ixtisas, magistratura səviyyəsində 21 ixtisas, doktorantura səviyyəsində 37 istiqamət üzrə pedaqoji kadr hazırlanır.



**Missiyamız**

Milli şüura malik, tədqiqatçı, məhsuldar, dərin düşüncəli, elmə, insan hüquqlarına hörmət edən, yaradıcı və innovativ şəxsiyyətlər yetişdirmək. Təhsil, tərbiyə, araşdırma və s. digər elmi-pedaqoji proseslər vasitəsilə cəmiyyətin texnoloji, sosial-iqtisadi və mədəni səviyyəsinin yüksəldilməsinə töhfə vermək.

**Vizyonumuz**

Beynəlxalq standartlara cavab verən tədqiqatçı-müəllim hazırlığını peşə təhsilinin əsasları, ixtisas və innovasiyalar istiqamətində həyata keçirmək.

**Hədəflərimiz**

Tələbələr üçün universitet məmnunluğunu gücləndirmək, tələbə nəticələrini yüksəltmək, universitetə yüksək bacarıqlara malik tələbələri cəlb etmək.




- 8 fakültə
- SABAH Mərkəzi
- 22 ixtisas
- 1 muzey
- Heydər Əliyev Mərkəzi
- Karyera Mərkəzi
- Azərbaycan Dövlət Pedaqoji Kolleci
- 5 filial

# Təhsil

ADPU-da tədris tam şəkildə Boloniya prosesinin və təhsil qanunvericiliyinin tələblərinə uyğun kredit sistemi əsasında həyata keçirilir. İstiqamətlər (ixtisaslar) üzrə tələbələrin təhsili Dövlət Təhsil Standartlarına uyğun tədris planı və fənn proqramları əsasında müəyyənləşdirilir.

Azərbaycan Dövlət Pedaqoji Universiteti təhsilə insanın, cəmiyyətin və dövlətin maraqları çərçivəsində şəxsiyyətin hərtərəfli inkişafı üçün ölkənin elmi, inzibati və təsərrüfat müəssisələri ilə qarşılıqlı əlaqədə universitet tərəfindən həyata keçirilən vahid proses kimi baxır, təhsilin yüksək keyfiyyətini ali təhsil müəssəsinin fəaliyyətinin ən vacib prioritetlərindən biri hesab edir və keyfiyyət siyasətinin formalaşmasını universitetin strateji idarəetmə əsaslarından biri kimi təklif edir.





# ADPU rəqəmlərdə

18000 nəfərdən çox təhsilalan;
4000 nəfərə yaxın subbakalavr;
13000 nəfərə yaxın bakalavr;
650 nəfərədək magistr;
100 nəfərədək doktorant;
650 nəfərədək əlavə təhsil alan;
2200 nəfərdən çox təhsilverən heyət;
1600 nəfərə yaxın akademik heyət;
650 nəfərdən çox inzibati heyət;
60-dan çox professor;
70-dək elmlər doktoru;
300-ə yaxın dosent;
350-dən çox fəlsəfə doktoru.

# Elmi tədqiqat strukturları

ADPU-da elmi və elmi-təşkilati fəaliyyət 8 fakültə üzrə 33 kafedrada, SABAH Mərkəzində, o cümlədən Azərbaycanda ilk dəfə 2017-ci ildə yaradılmış Türksoy kafedrası, Elmi Tədqiqat Mərkəzi, Elmi-təşkilati şöbə və Magistratura və doktorantura şöbələri vasitəsi ilə həyata keçirilir. Son illərdə təsdiq edilmiş mövzu planı əsasında 741 nəfərdən ibarət professor-müəllim heyəti 67 istiqamətdə, 106 problem üzrə 386 mövzuda elmi tədqiqat işlərini davam etdirmiş, tətbiqi və innovasiya xarakterli ən əhəmiyyətli 164 iş tədris prosesində praktik tətbiq hüququ qazanmışdır.



# Laboratoriya və mərkəzlər

Son illərdə universitetdəki "Yeni bioloji aktiv birləşmələr", "Koordinasion birləşmələr", "Nadir torpaq metal materiallarının fizikası", "Pedaqoji təhsilin problemləri", “Türk araşdırmaları” və "Bioinformatika" elmi tədqiqat laboratoriyalarında fundamental və tətbiqi tədqiqatlara istiqamətlənmiş elmi tədqiqat işləri yerinə yetirilmişdir. Bu elmi tədqiqat laboratoriyalarının bazasında 2019-cu ildən 18 ştat vahidi ilə Elmi Tədqiqat Mərkəzi yaradılmışdır. Universitetin əməkdaşları tərəfindən yalnız 2018-ci ildə 235-i xarici ölkələrin elmi jurnallarında (35-i impakt faktorlu jurnalarda) olmaqla 1104 elmi məqalə, 364 tezis (xaricdə - 144), 7 monoqrafiya, 32 dərslik, 83 dərs vəsaiti, 223 proqram, metodik vəsaitlər və s. nəşr olunmuşdır.





# Xarici əlaqələr

ADPU 34 xarici universitet ilə əməkdaşlıq edir, tələbə mübadiləsi həyata keçirir. Türkiyənin 11 universitetində "Mövlanə" mübadilə proqramı çərçivəsində tələbələr üçün təhsil şəraiti yaradır. Partnyor universitetlərdən olan tələbə və müəllimlər qarşılıqlı olaraq bu proqramdan yararlana bilir. Ümumilikdə Türkiyə (11), Rusiya (8), Ukrayna (2), Rumıniya (1), ABŞ (1), Qazaxıstan (4), Litva (2), İndoneziya (1), BƏƏ (1), İsveçrə (1), Özbəkistan (1), və Moldova (1) universitetləri ilə əməkdaşlıq edilir.

"Erasmus+" mübadilə proqramı "Erasmus+" tərəfdaş universitetləri arasında tələbə, akademik və inzibati heyətin mübadiləsini həyata keçirir.

Avrasiya Universitetlər Birliyi (EURAS), Kafkasya Universitetlər Birliyi (KÜNİB) kimi beynəlxalq assosiasiyalarla yaxından əməkdaşlıq edilir.

**ADPU-nun üzv olduğu beynəlxalq təşkilatlar:**
- ETEN - Avropa Müəllim Hazırlığı Şəbəkəsi - 2009-cu ildən
- İAUP - Universitet Prezidentlərinin Beynəlxalq Assosiasiyası - 2017-ci ildən

"2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində ADPU və ABŞ-ın Vaşinqton şəhərində yerləşən Corc Vaşinqton Universiteti (CVU) ilə 31 yanvar 2020-ci il tarixində ikili diplom proqramı üzrə müqavilə imzalanıb. Müqaviləyə əsasən universitetin "Menecment (təhsilin təşkili və idarə olunması)" ixtisası üzrə magistratura pilləsini bitirən tələbələr hər iki universitetin diplomunu əldə edə biləcək (proqramın məzunları müvafiq olaraq CVU-nun "Təhsil və insan inkişafı: Təhsil siyasəti və liderlik" magistr ixtisasına da yiyələnəcək).



# Kitabxana və nəşriyyat

Kitabxana öz fəaliyyətində universitetin profilinə uyğun olaraq tədris, elmi tədqiqat, təlim-tərbiyə prosesində, eyni zamanda informasiya təminatının həyata keçirilməsində, çap məhsullarının alınaraq oxuculara çatdırılmasında mühüm rol oynayır.

Kitabxananın fondu 755.715 nüsxə ədəbiyyat təşkil edir. Kitabxananın fondunda hal-hazırda kiril əlifbası ilə 640 adda 47360 nüsxə, latın əlifbası ilə 9451 adda 75154 nüsxə dərslik və dərs vəsaiti mövcuddur. Fondun həcminə görə universitetin kitabxanası respublika universitet kitabxanaları arasında ikinci yerdədir.

2019-cu ilin iyul ayından Kitabxana İnformasiya Mərkəzinin *https://kitabxana.adpu.edu.az* rəsmi saytı fəaliyyətə başlamışdır. Burada tələbələr elektron kitabxana xidmətindən istifadə edə bilərlər.

Universitetin daxili nəşriyyatında son 5 ildə bakalavriat təhsil pilləsinə uyğun 2125 adda dərs vəsaiti, metodik vəsait və metodik göstərişlər çap olunmuşdur.



# Tələbə həyatı

Universitetimiz indini və gələcəyi özündə birləşdirən "Tələbə həyatı" strategiyası yaradıb. Universitetin əsaslı kitabxanası və internet şəbəkəsi vardır. Bütün tədris korpuslarında oxu zalları, kitabxana və kompüter otaqları da tələbələrin ixtiyarına verilib.

**Azərbaycan Dövlət Pedaqoji Universitetində aşağıda qeyd olunan tələbə təşkilat və klubları müvəffəqiyyətlə fəaliyyət göstərir:**

Dərnəklər;
İdman seksiyaları;
Düşərgələr;
ADPU Tələbə Elmi Cəmiyyəti;
ADPU Həmkarlar İttifaqı Komitəsi;
ADPU Təhsil Könüllüləri İctimai Birliyi;
ADPU Tələbə Gənclər Təşkilatı;
ADPU YAP Gənclər Birliyi;
ADPU Türk Öğrenci Yönetim Konseyi və s.



# SABAH qrupları

Ali təhsildə tədrisin keyfiyyətinin yüksəldilməsi, yeni və fərqli təhsil mühitinin yaradılması, savadlı, bacarıqlı və hazırlıqlı tələbə yetişdirilməsi, əmək bazarının artan tələblərinə müvafiq olaraq kadr hazırlığının təmin edilməsi məqsədilə 2014/2015-ci tədris ilindən Təhsil Nazirliyi tərəfindən yaradılmış SABAH qrupları aşağıdakı hədəflərə ünvanlanıb:

- Təhsildə innovativ tədris metodlarının tətbiqi
- Təhsilalanların təşəbbüslərinin dəstəklənməsi və qabaqcıl təcrübənin tətbiqi
- Təhsilverənlərin inkişafı və stimullaşdırılması
- Akademik və biznes mühitlərinin əlaqələrinin genişləndirilməsi və inteqrasiyası

**SABAH-ın fərqli cəhətləri:** yenilənmiş tədris planı (sillabus), tələbəyönümlü yanaşma, sənaye müəssisələri, özəl və dövlət qurumlarında təcrübə proqramları, interaktivlik, yenilikərlə tanışlıq, intensiv ingilis-dili dərsləri

SABAH qrupları 5 ixtisas qrupuna (təhsil, humanitar, iqtisadiyyat, texniki, təbiət) daxil olan 34 ixtisas üzrə bakalavriat səviyyəsinin I tədris ilini müvəffəqiyyətlə bitirmiş tələbələrdən müsabiqə yolu ilə seçim aparmaqla formalaşdırılır.

2019/2020-ci tədris ilinin nəticələrinə görə ADPU-da SABAH qrularında 4 ixtisas üzrə 300 nəfərədək tələbə təhsil alır. SABAH-ın ilk buraxılışı isə 2016-2017-ci tədris ilində olub.



# ADPU-nun filialları

## Şəki Filialı
Tələbə sayı – 800 nəfərədək
Akademik heyət sayı – 100 nəfərədək

## Quba Filialı
Tələbə sayı – 900 nəfərədək
Akademik heyət sayı - 100 nəfərədək

## Cəlilabad Filialı
Tələbə sayı – 400 nəfərədək
Akademik heyət sayı – 50 nəfərədək

## Şamaxı Filialı
Tələbə sayı – 550 nəfərədək
Akademik heyət sayı - 50 nəfərədək

## Ağcabədi Filialı
Tələbə sayı – 600 nəfərədək
Akademik heyət sayı - 50 nəfərədək



# ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci

Kollec 1919-cu ildən indiyə kimi müxtəlif adlarla fəaliyyət göstərib. Hazırda müasir təchizatlı 2 tədris binası ilə tələbələrinin xidmətindədir.

Kollecdə əyani və qiyabi şöbələr üzrə ümumilikdə 4000 nəfərə yaxın tələbə təhsil alır.

Kollecdə 250 nəfərə yaxın müəllim fəaliyyət göstərir ki, onların arasında elmlər doktorları, professorlar, 20 nəfərədək fəlsəfə doktoru, 20 nəfərədək baş müəllim və 30 nəfərdən çox dissertant yer alır.



100




# Azərbaycan Dövlət Pedaqoji Universiteti

**1. Səbail (əsas) tədris binası**
Bakı şəh., AZ1000, Səbail rayonu, Üzeyir Hacıbəyli küç., 68

**2. Gənclik tədris binası**
Bakı şəh., AZ1072, Nərimanov rayonu, Akademik Həsən Əliyev küç., 104

**3. Nəsimi tədris binası**
Bakı şəh., AZ1007, Nəsimi rayonu, Nəsib bəy Yusifbəyli küç., 60

**4. Təbriz tədris binası**
Bakı şəh., AZ1008, Nəsimi rayonu, Koroğlu Rəhimov küç., 13

**Universitetlə əlaqə**

Tel. (+994 12) 493 00 32
Fax. (+994 12) 598 37 71
E-poçt: office@adpu.edu.az
Facebook.com/adpu.eduaz
Instagram.com/adpu.eduaz
www.adpu.edu.az
www.facebook.com/adpu.eduaz

ADPU-nun
Tanıtım Filmi



